Azərbaycan Respublikası

# ELMİ İŞ

(Aylıq beynəlxalq elmi-nəzəri jurnal)

***№ 10 (26)***

# НАУЧНАЯ РАБОТА

(Ежемесячный международный
научно-теорретический журнал)

***№ 10 (26)***

# SCIENTICAL WORK

Azerbaijan Republic Amonth International
Science oritical journal`s

***№ 10 (26)***

**Bakı - 2010**

# MÜNDƏRİCAT

# MƏDƏNİ ƏLAQƏLƏRİN GENİŞLƏNMƏSİNDƏ BƏDİİ TƏRCÜMƏ İŞİNİN VƏ QARŞILIQLI YUBİLEYLƏRİN KEÇİRİLMƏSİNİN ROLU

***Şikar Qasımov,*** *tarix elimlər doktoru, Azərbaycan Texniki Universiteti «Tarix» kafedrasının müdiri.*

Azərbaycan mədəniyyətinin inkişaf tarixini izləyərkən ədəbi-mədəni əlaqələrin, xüsusən yaradıcılıq əlaqələrinin çox qədim tarixə malik olduğunun bir daha şahidi oluruq. 20-ci illərdə ədəbi-mədəni əlaqələrin özünə məxsus formaları və xüsusiyyətləri var idi. Araşdırmalar göstərir ki, 20-30-cu illərin inzibati-amirlik şəraitində yaradıcı ziyalıların əlaqələrinin yaranması və inkişafı çox tərəfli formalarda təzahür edirdi. Bu əlaqələr 20-ci illərdən başlayaraq yeni istiqamət, yeni forma almışdı. Elə bu dövrdən yaradıcılıq əlaqələri bir problem kimi ədəbiyyatşünaslığın və tarixşünaslığın tədqiqat obyektinə çevrilmişdi. Əsas məqsəd isə yaradıcı ziyalıların əlaqələrini tədqiq etməklə bu əlaqələrin genişlənməsinə zəmin yaradan amillərin əsas cəhətlərini, komponentlərini açıb göstərməkdir. 1920-ci ilin yazından sovetləşmənin sürətlə getməsinə paralel olaraq Azərbaycan ziyalılarını yeni sovet ideologiyasına «uyğunlaşdırmaq» üçün ciddi «tədbirlər» görülürdü. Bir tərəfdən yaradıcılığında sovet həyat tərzini əks etdirməyən yazıçıları cəmiyyətdən uzaqlaşdırır, digər tərəfdən də yazıçı ziyalıların guya savadlarını, dünya görüşlərini «artırmaq» üçün mərkəzə- Moskvaya göndərirdilər. Belə bir şəraitdə Bakıda kommunist ideologiyasına uyğun əsərlər daha fəal təbliğ və tərcümə olunurdu.

Sovet hakimiyyətinin ilk illərindən başlayaraq müttəfiq respublikalar arası yaradıcılıq əlaqələrinin ən mühüm və fəal sahələrindən biri bədii tərcümə idi. 1920-ci illərdən başlayaraq dünya və sovet xalqları ədəbiyyatlarından, xüsusilə rus ədəbiyyatından ilk növbədə dövrün, müasirliyin tələblərinə uyğun əsərlər Azərbaycanda yayılırdı. Bununla yanaşı, dünya və rus klassiklərinin ən yaxşı əsərləri də dilimizə tərcümə edilərək nəşr olunurdu. Tərcümələr əsasən rus dili vasitəsilə edilirdi. Bu mənada hələ 20-ci illərin əvvəllərindən SSRİ-nin yaranmasından etibarən rus dili ümumittifaq ünsiyyət vasitəsinə çevrilmişdi.

Sosializm quruculuğu şəraitində yaradıcılıq əlaqələrinin genişlənməsi ciddi maneələrlə, inzibati-amirlik və repressiyalar ilə üzləşsə də bu proses bu və ya digər yollar-

la genişlənməyə başladı. Digər respublikalarda olduğu kimi, Azərbaycanda da yaranan gənc yaradıcı qüvvələrdə digər xalqların şair və yazıçılarının yaradıcılığından qarşılıqlı şəkildə öyrənməyə meyl əmələ gəldi.

1917-ci ilin Oktyabrından sonra keçmiş sovetlər birliyində yaşayan xalqların mədəni əlaqələrində dəyişiklik baş verdi. Bu əlaqələr müxtəlif formalarda yaradılırdı. Həmin formalar maarif və elm, kadr hazırlığı, ədəbiyyat və incəsənət sahəsindəki əməkdaşlıqdan ibarət idi. Bunu Azərbaycanın digər keçmiş ittifaq respublikaları ilə əlaqəsi timsalında aydın görmək olar. Bu əlaqə, ilk növbədə savadsızlığın aradan qaldırılması uğrunda mübarizə formasında və ədəbi-elmi əlaqələrin inkişafı zəminində yaranırdı.

1930-cu illərdə, xüsusilə 1932-ci ildən sonra ədəbi, elmi və mədəni əlaqələrdə güclü intensivlik müşahidə olunur. Çünki bu zaman yaradıcılıq ittifaqları, Elmlər Akademiyasının yerli filialları əlbir işləyir, həm ədəbi və mədəni yaradıcılıqda, həm də elmi quruculuq və təhsildə ümumsovet maraqları ön plana keçir, ümumən əsərlərdə və həyata keçirilən tədbirlərdə müştərəkliyə xüsusi diqqət yetirilirdi. Bunun müsbət cəhəti o idi ki, müttəfiq respublikalar bir-birlərinin mədəni-elmi nailiyyətlərini qarşılıqlı şəkildə zənginləşdirir, mənfiliyi isə ideoloji yekrənglik əmələ gətirməsi idi, bu isə özlüyündə milli simasızlaşmaya şərait yaradırdı.

Çoxmillətli sovet xalqlarının əməkdaşlığı və köməyi ilə Azərbaycanda ali, orta ixtisas və texniki-peşə məktəblərinin sayı artırdı. Ali məktəblərdə mühazirə oxuyan müəllimlərin əksəriyyəti başqa respublikalardan gəlmişdilər. Məsələn, 1921-1922-ci dərs ilində Xarkov Tibb Qadınlar İnstitutunun professoru S.M.Davidenko, Moskva Hərbi Tibb Akademiyasının dosenti F.N.İltin, Moskva Universitetinin professoru M.A.Çlenov və başqaları mühazirə oxumaq üçün ADU-ya dəvət olunmuşdular. Akademik İ.M.Qubkin, V.V.Bartold, D.Y.Kolubyatnikov, P.Y.Marr, P.K.Cuze və başqaları ali məktəblərdə laboratoriyaların, fənn kabinetlərinin təşkilində, milli kadrların hazırlanmasında və elmi tədqiqat işlərinin genişləndirilməsində böyük fəaliyyət göstərmişlər. Moskva, Kiyev, Leninqrad və başqa şəhərlərin ali məktəblərində hər il Azərbaycan üçün də yer ayrılırdı.

Respublikalararası mədəni əməkdaşlığın formalarından biri də ədəbi əlaqələr idi. Yazıçıların əsərlərinin qarşılıqlı tərcüməsi də sovet respublikaları arasında mədəni əlaqələrin inkişafında və yazıçıların ədəbi irsinin yayılmasında mühüm rol oynayırdı. 1921-1932-ci illərdə 500-dən çox əsər Azərbaycan dilinə tərcümə olunmuşdu (24,v.261). Müttəfiq respublikalarının şair və yazıçılarının Azərbaycana gəlməsi və öz növbəsində Azərbaycanın bədii söz ustadlarının digər respublikalara getməsi ədəbi əlaqələrin genişlənməsinə səbəb olurdu. Azərbaycan yaradıcılıq ittifaqlarının fəaliyyətində ədəbi-mədəni əlaqələr sahəsində əsas yeri bədii tərcümə və ədəbiyyatların təbliği tuturdu. Azərbaycan yazıçılarının və şairlərinin əsərləri yalnız ana dilində deyil, habelə rus və başqa xalqların dillərinə tərcümə edilirdi. Belə ki, 1921-1930-cu illərdə Azərbaycan yazıçılarının 95 əsəri 2,5 milyon nüsxə tirajla SSRİ xalqlarının dillərində nəşr olunmuşdu. M.F.Axundovun, M.Ə.Sabirin, M.S.Ordubadinin, A.Şaiqin, C.Məmmədquluzadənin, S.Vurğunun, S.Rəhimovun, H.Cavidin əsərləri rus dilində və başqa xalqların dillərində nəşr edilmişdi. 1930-1935-ci illərdə S.Vurğunun bir sıra şerləri Gürcüstanda və Ukray-

nada çap olunmuşdu. 1932-ci ildə Ukraynanın «Proletar», «Kommunist», «Bednota» və başqa qəzetləri Azərbaycan yazıçı və şairlərinin əsərlərindən parçalar tərcümə edib nəşr etmişdi.

1929-cu il iyunun 17-də Tiflisdə incəsənət sarayında Zaqafqaziya yazıçıları nümayəndə heyətlərinin muşavirəsi keçirilmişdi. Müşavirə «Zaqafqaziya respublikaları sovet yazıçıları və incəsənət işçiləri mədəni ittifaqı» təşkilat komitəsini və kollektivin rəyasət heyətini seçdi. 17 iyun gününü Zaqafqaziyanın mədəni quvvələrinin birləşdirilməsi günü elan etməyi qərara aldılar. «Zaqafqaziya proletar yazıçıları ittifaqı»nın təşkilat əsası qoyuldu. Onun «Na rubeje vostoka» adlı orqanı yaradıldı (23,46). İttifaqın təşkil olunması Zaqafqaziya respublikaları yazıçılarının əsərlərinin bir dildən başqa bir dilə tərcümə edilməsi üçün geniş imkan yaratdı. Bu ittifaqın köməyi ilə hər bir xalq digər xalqın şair və yazıçılarının əsərlərini öz ana dillərində oxuyurdu. Müttəfiq respublika yazıçılarının ədəbi irsinin Azərbaycanda yayılmasında Ə.B.Haqverdiyev, S.S.Axundov, M.S.Ordubadi, C.Cabbarlı, S.Vurğun, M.Muşfiq, S.Rustəm, M.Rəfili, S.Hüseyn, A.Şaiq, M.Arif və başqalarının xidmətləri olmuşdur. Bu yaradıcı quvvələrin təşəbbüsü ilə rus və başqa xalqların ədəbiyyatlarından yüzlərlə əsər Azərbaycan dilinə tərcümə olunmuşdu (24,v.26).

Respublikaların yaradıcı təşkilatlarının və kollektivlərinin birgə müşavirə, konfrans və qurultaylarının keçirilməsi xalqların əldə etdiyi mədəni sərvətlərin mübadilə edilməsində ən mühüm formalardır. Təkcə 1935-ci ildə rus və digər xalqların ədəbiyyatının 84 adda əsəri Azərbaycan dilində böyük tirajla nəşr olunmuşdu. 1936-cı ildə Azərnəşrdə «Gurcu poeziyası antologiyası», Şota Rustavelinin «Bars dərisi» poemasından parçalar nəşr olunmuşdu (16). 1936 – cı ildə «Kommunist» qəzetidə Puşkinin, Lermontovun, Mayakovskinin ədəbi fəaliyyətinə aid çoxlu məqalələr dərc edilmişdir.

1935-1938-ci illərdə Azərbaycan dilinə tərcümə olunan əsərlər içərisində gürcü sənətkarlarının əsərləri böyük yer tuturdu. Azərbaycanın görkəmli aşıqlarından Aşıq Mirzə «Böyük usta» (17), Aşıq Əsəd «Şota Rustaveliyə» adlı şerlər (7) yazmışlar.

1936-cı il aprelin 10-da Moskvada «Pravda» qəzeti redaksiyasında müşavirə çağırıldı. Müşavirədə S.Vurğun, S.Hüseyn və başqaları Azərbaycan ədəbiyyatının ən yaxşı nümunələrinin digər xalqların dillərinə tərcümə edilməsi üçün əməli təkliflə çıxış etdilər. SSRİ xalqlarının ən yaxşı ədəbi əsərlərinin 5 cildliyinin 2-ci cildinə S.Vurğunun «Azərbaycan» poeması, 4-cü cildinə isə Seyid Hüseynin «Yeni Azərbaycan qadını» adlı hekayəsi daxil edildi (8).

30-cu illərdə Azərbaycan mərkəzi mətbuat orqanlarında Ukrayna ədəbiyyatının ən yaxşı nümunələrinin nəşrinə diqqət verilirdi. Rajan Mixalo «Döyüş qabağı gecəsi» poemasından (tərcümə edəni Hüseyn Natiq) (9), Taras Şevçenkonun «Portreti» (9) və başqa əsərlərdən şer və parçalar nəşr edilmişdir. Bununla yanaşı, Azərbaycan nümayəndələri başqa respublikalarda keçirilən tədbirlərdə yaxından iştirak edirdilər. 1936-cı il fevralın 5-də Azərbaycan yazıçılarından M.K.Ələkbərli, H.Cavid, M.S.Ordubadi, Ə.Nazim, S.Rustəm, M.Müşfiq və M.Rahim Minskiyə getmiş, Belorusiya yazıçılarının plenumunda iştirak etmişlər (18). Həmin ilin aprel ayında bir qrup Ukrayna yazıçısı- Donbas ya-

zıçılarından M.Upenik, N.Baydaçenko, M.Bespoşadnı, B.Çerkasssski, İ.Farber və başqaları Azərbaycana gəlmişlər. Bakıda Donbas yazıçılar briqadası çox böyük təntənə ilə qarşılanmışdı. Onlar Azərbaycan Sovet Yazıçıları İttifaqının sədri M.K.Ələkbərli, şair və yazıçılardan M.S.Ordubadi, T.Ş.Simurq, Y.V.Çəmənzəminli, S.Rüstəm, M.Müşfiq, M.Hüseyn və başqaları ilə görüşmüş, fikir mübadiləsi etmişlər.

Ukrayna yazıçılarının Azərbaycana səfəri münasibətilə keçirilən ilk görüşdə M.K.Ələkbərli demişdi: «Biz sizin gəlişinizi ürək çırpıntısı ilə gözləyirdik. Bu gəliş zəruri idi. Çünki Bakı fəhlələrinin Donbas şaxtaçıları ilə istehsalat yarışı apardığı bir zamanda ... biz yazıçıların bir-birimizdən ayrı işləməyimiz düzgün olmazdı» (10). M.Upenik Azərbaycandan qayıtdıqdan sonra yazmışdır: «Azərbaycanı sevməmək olmaz. Bu sərt və nəvazişkar diyar öz rəngarəngliyi, əlvanlığı ilə adamı heyran qoyur... onun sərvətləri tükənməzdir. Ən qiymətli sərvəti isə, əlbəttə, gözəl insanlarıdır» (10).

Tərcümə kimi mühüm sahəyə də məhz yaradıcılıq ittifaqları rəhbərlik edir, qarşılıqlı tərcümə üçün əsərlər, əsasən, yaradıcılıq ittifaqları tərəfindən təklif olunurdu. Əlbəttə, bu sahədə, xüsusilə sovet yazıçılarının I Ümumittifaq qurultayından sonra dostlaşmış və qardaşlaşmış yazıçıların şəxsi münasibətlərinin də müəyyən rolu var idi. O dövrdə tərcümə olunmuş əsərlər bu mənzərəni yaxşı əks etdirir: A.Barbüs «Hücum» (1925), P.Merime «Qiyam» (1925), Şiller «Vilhelm Tel» (1925), V.Şekspir «Hamlet» (1926), V.Hüqo «39 – cu il» (1926), E.Zolya «Qazmaçılar» (1927), V.Hüqo «Gülən Adam» (1927), Covani «Spartak» (1928), A.Barbüs «Od içində» (1930), E.Zolya «Tələ» (1930), C.Vern «Kapitan Qrantın uşaqları» (1930), Mopasson «Gözəl dost» (1931), V.Hüqo «Səfillər» (1933), V.Şekspir «Maqbet» (1932), Voyniç «Ovod» (1933), A.Frans «Mələklərin üsyanı» (1933) və s.

Bu dövrdə L.Tolstoyun «Hacı Murad» (1929), N.V.Qoqolun «Evlənmə» (1928), A.S.Puşkinin «Kapitan qızı», A.Fadayev «Tarmar» (1928), M.Y.Lermontovun «Zəmanəmizin qəhrəmanı» (1929), İ.S.Turqenevin «Atalar və oğullar» (1929), D.Furmanovun «Çapayev» (1929), A.S.Puşkinin «Dubrovski», «Qaraçılar» (1930), N.V.Qoqolun «Taras Bulba» (1930), M.Qorkinin «Ana» (1930), F.Qladkovun «Sement» (1930), A.Serafimoviçin «Dəmir axın» (1930), A.Blokun «12-lər» (1932), M.Qorkinin «Həyatın dibində» (1932) və s. kimi təqribən 100–ə yaxın əsər tərcümə və çap olunmuşdur.

Ədəbi əlaqələrin əsas istiqamətlərindən biri də dünya və sovet yazıçılarının yubileylərinin qeyd olunması, onlar haqqında kitab və məqalələrin yazılması idi. 30-cu illərin ikinci yarısından etibarən Azərbaycanın şair və yazıçılarının əsərləri rus, ukrayna, belarus, gürcü, özbək və b. xalqların dillərinə tərcümə edilmişdir. Yazıçıların əsərlərinin qarşılıqlı tərcüməsi keçmiş sovet respublikaları arasında mədəni əlaqələrin inkişafında və yazıçıların ədəbi irsinin yayılmasında mühüm rol oynayırdı.

Kommunist Partiyasının göstərişi ilə K.Marksın, F.Engelsin, V.İ.Leninin əsərləri, partiya və hökumətin qətnamə, qərarları, partiya və dövlət xadimlərinin məruzə və çıxışları Azərbaycan dilinə tərcümə edilirdi. Marksizm-leninizm klassiklərinin əsərlərinin tərcümə edilib nəşr edilməsində partiya və dövlət xadimlərindən S.M.Kirov, S.Ağamalıoğlu, R.Axundov, D.Bünyadzadə, Ə.H.Qarayev, Q.Musabəyov, H.Sultanov

və başqalarının böyük rolu olmuşdur. Sosializm quruculuğu illərində respublika partiya təşkilatının göstərişi ilə yalnız marksizm-leninizm klassiklərinin əsərləri və partiyanın qətnamə və qərarları zəhmətkeşlər içərisində geniş təbliğ edilirdi. «Pravda», «İzvestiə», «Zarğə Vostoka» və yerli mətbuat bu işdə partiya, komsomol və həmkarlar təşkilatlarına yaxından kömək göstərirdi. Klassiklərin əsərlərinin və partiya qərarlarının təbliği birtərəfli qaydada aparılır, azad düşüncə və yeni fikir boğulurdu.

Bütün sovet respublikalarında olduğu kimi, Azərbaycanda da 1930-cu illərdə marksizm-leninizm klassiklərinin əsərlərinin tərcümə edilməsinə böyük diqqət yetirilirdi. Məsələn, 1932-ci ilin baharında Azərbaycan K(b)P MK bürosu V.İ.Leninin seçilmiş əsərlərinin 6 cildliyinin nəşr edilməsi işini təşkil etmək məsələsini müzakirə etdi. Büro bu məqsədlə redaksiya heyətinin tərkibinə R.Axundov, M.Məmmədov, M.Şahbazov, Ə.Kərimov və başqalarını daxil etdi (22). 1933-cü ilin yayında Bakıda partiya nəşriyyatı təşkil edildi (2,v.177). Həmin ilin yazında nəşriyyat fəaliyyətə başlayaraq birinci dəfə olaraq V.İ.Leninin 6 cildlik seçilmiş əsərlərini Azərbaycan dilində çapdan buraxdı.

Azərbaycan partiya təşkilatı marksizm-leninizm klassiklərinin əsərlərinin tərcümə edilməsinə xüsusi diqqət verirdi. Bununla oxucuları məqsədli şəkildə dünya ədəbiyyatı xəzinəsindən təcrid edir, yalnız şüurlara sosializm ideologiyası aşılanırdı. Azərbaycan K(b)P MK-nın 1934-cü il martın 21-də qəbul etdiyi qərara əsasən (3,v.22) respublikadan Leninqrada tərcüməçi və redaktor hazırlayan kursa nümayəndə göndərilmişdi.

Azərbaycan K(b)P MK-sı K.Marks və F.Engelsin iki cildlik əsərlərinin Azərbaycan dilində nəşr edilməsi üçün H.Rəhmanov, R.Axundov, Q.Sadıqov, İ.İsmayılovdan ibarət yeni redaksiya heyətini təsdiq etdi. Eyni zamanda V.İ.Leninin əsərləri külliyyatının redaktorlar heyətinə Mirzə Məmmədov, Qulam Sultanov, Vəli Xuluflu, Balabəy Həsənbəyov daxil edildi (4, v.2).

Bütün bu tədbirlər Azərbaycanda bir tərəfdən nəşriyyat işinin artırılmasına səbəb olurdusa, digər tərəfdən inzibati-amirlik metodu ilə Kommunist Partiyası və onu yaradanlar təbliğ olunurdu. 1940-cı ildə 1141 adda 4930 min tiraj kitab nəşr edilmişdir. Bunlar mədəni quruculuq sahəsində böyük irəliləyişlər demək idi. Milli ədəbiyyatların ən yaxşı nümunələrinin tərcümə olunub yazılması, ədəbiyyat və incəsənət günləri, həftələri keçirilməsi bədii sərgilərin təşkil olunması, birgə müşavirə, konfrans və qurultayların keçirilməsi ədəbi əlaqələrin genişlənməsində geniş rol oynayırdı. 30-cu illərdə A.S.Puşkinin, L.N.Tolstoyun, M.Qorkinin, M.Lermantovun, N.Qoqolun, N.Ostrovskinin, Ş.Rustavellinin, M.Şoloxovun və b. bir çox əsərləri Azərbaycan oxucuları arasında yayılmışdı. 1935-1938-ci illərdə Azərbaycan dilinə tərcümə olunan əsərlər içərisində gürcü yazıçılarının əsərləri üstün yer tuturdu. 30-cu illərdə respublikanın mərkəzi orqanlarında Ukrayna ədəbiyyatının ən yaxşı nümunələrinin çap edilməsinə böyük diqqət verilirdi.

Erməni ədəbiyyatının nümayəndələri: X.Abovyan, M.Nalbandyan, H.Tumanyan, A.Şirvanzadə kimi sənətkarlar öz əsərlərində bayağı və yabançı xalqlar dostluğu və qardaşlığı ideyasını böyük məhəbbətlə tərənnüm edirdilər. Saxtakarlıq üzərində qurulan saxta dostluğun fərqinə varmayan xalqımız mədəniyyət xadimlərinin köməyi ilə Azərbaycanda erməni yazıçılarının əsərləri, erməni dilindəcə geniş yayılırdı. Bu azmış kimi

hələ 1933-cü ilin yanvarında Bakıda erməni dilində «Şura yazıçısı» adlı jurnal (6,v.1) da nəşr edilirdi. Bütün bunlara isə beynəlmiləlçilik donu geyindirilirdi. Sovet respublikaları yazıçılarının həyat və fəaliyyətinə aid yazıların mətbuatda dərc edilməsi, oxucular arasında onların kitablarının yayılması sonrakı illərdə daha da genişlənmişdi.

Bütün bunlarla bərabər, Azərbaycan yazıçı və şairlərinin də ən yaxşı əsərləri rus və digər xalqların dillərinə tərcümə edilirdi. 1933-1934-cü illərdə M.F.Axundovun, Q.Zakirin, M.Ə.Sabirin, A.Səhhətin, Ə.Haqverdiyevin, C.Cabbarlının, M. S. Ordubadinin, S.Vurğunun, S.Rüstəmin, A.Şaiqin, H.Cavidin və başqalarının əsərləri rus, ukrayna, belarus, gürcü, özbək, ləzgi və başqa xalqların dillərinə tərcümə edilmişdir. Bu kimi tədbirlər sovet respublikaları arası əlaqələrin genişlənməsinə mühüm təsir edirdi.

30-cu illərdə müttəfiq respublikaların görkəmli alim, yazıçı və şairlərinin yubiley günlərinin bütün respublikalarda qeyd edilməsi də ədəbi əlaqələrin genişlənməsinə imkan verirdi. Belə ki, Azərbaycanda A.S.Puşkinin, M.E.Lermotovun, T.Şevçenkonun, Ə.Nəvainin, N.Qoqolun, N.Ostrovskinin, M.Qorkinin, V.Belinskinin və başqalarının yubileyləri geniş qeyd edilmişdi.

Digər respublikalarda öz növbəsində Azərbaycanın görkəmli sənətkarlarının yubileylərini geniş qeyd edirdilər. 1925-ci ilin fevral ayında N.Nərimanovun anadan olmasının 50 illiyi, ədəbi fəaliyyətinin 30 illiyi bütün ölkədə qeyd edildi. 1928-1930-cu illərdə Tiflisdə H.Cavidin, M.S.Ordubadinin, C.Cabbarlının yaradıcılığına həsr olunmuş gecələr keçirilmişdir. Bu cür gecələr Ukraynada, Belorusiyada, Moskvada və Leninqradda da keçirilmişdir.

1927-ci ildə Azərbaycanda M.Qorkinin anadan olmasının 60, ədəbi fəaliyyətinin 35 illiyi keçirilmişdir (12,13). A.S.Puşkinin anadan olmasının 130 illiyi təntənə ilə qeyd olunmuşdur (13,11). L.N.Tolstoyun anadan olmasının 100 illiyi (19), M.Nalbandyanın anadan olmasının 100 illiyi (20), A.Şirvanzadənin ədəbi fəaliyyətinin 50 illiyi (21), B. Şounun anadan olmasının 75 illiyi (14), B.Hötenin vəfatının 100 illiyi (11) və M.Qorkinin ədəbi fəaliyyətinin 40 illiyi (15) təntənə ilə qeyd olunmuş, onların ədəbiyyatımızla əlaqələri barəsində kitabçalar və məqalələr dərc olunmuşdu. 1932-ci ildə tənqidçi-ədəbiyyatşünas M.Rəfilinin «Vladimir Mayakovski» kitabı çapdan çıxmışdır.

Bütün bunlar onu göstərir ki, 1920-30-cu illərdə yaradıcılıq əlaqələrinin genişlənməsində bədii tərcümə işinin, görkəmli ədib və sənətkarların yubileylərinin keçirilməsinin böyük rolu olmuşdur.

## ƏDƏBİYYAT.

1. ARDSPİHA, f. 1,. siy. 74, iş 318, v. 177.
2. ARDSPİHA, f. 1, siy. 235, iş 481, v. 22.
3. ARDSPİHA f. 1. siy. 235. iş 338, v. 2.
4. ARDSPİHA f. 1,siy. 236, iş 53, v. 1.
5. «Ədəbiyyat» qəz., 1938, 9 yanvar.
5. «Ədəbiyyat» qəz., 1939, 24 oktyabr.
6. «Ədəbiyyat» qəz., 1938, 8 yanvar.
7. «Ədəbiyyat» qəz., 1936, 26 aprel.
8. «Hücum», 1932, № 3-4.
9. «İnqilab və mədəniyyət», 1928, № 5, s.13.
10. «İnqilab və mədəniyyət», 1929, № 6, s.11.
11. «İnqilab və mədəniyyət», 1931, № 7-8.
12. «İnqilab və mədəniyyət», 1932, № 8-9.
13. «Kommunist» qəz., 1936, 22 fevral.
14. «Kommunist» qəz., 1936, 24 aprel.
15. «Kommunist» qəz., 1936, 5 fevral.
16. «Kommunist» qəz., 1929, 16 sentyabr.
17. «Kommunist» qəz., 1929, 11 dekabr.
18. «Kommunist» qəz., 1930, 15-16 yanvar.
19. «Kommunist» qəz., 1932. 15 aprel.
20. Paşayev N. Zaqafqaziya respublikalarının elmi və mədəni əlaqələri. Bakı, 1962, s. 46.
21. RFDA, f. 3316, siy. 16, iş 14, v. 26.

**Резьюме**

**Ш.М.Гасымов, д.и.н.,дос.**

**Из истории проведения юбилеев выдающийся деятелей искусств и работы худоъественных переводов (1920-30-ые годы).**

В статье на основе богатых материалов и архивных документов изучены роль худоъественного перевода в развитии творческих связей, а так ъе значение проведения юбилеев выдающийся творческих интелегенции.

**SUMMARY**

**S.M.Qasimov The doktore of history science. Senior lecturer.**

**The role of artistic translation and history of anniversary creahve relations to the enlargement of creative relations (1920-30).**

To the enlargement of creative relations the role of artistic translation and the role of celebrating anniversary of well-known artisans were explored in the article on the basis of rich and archaic materials.

# ALGUNAS PARTICULARIDADES ESTILÍSTICAS Y GRAMATICALES DEL USO DE LOS PRONOMBRES TÚ, USTED Y VOS DEL ESPAÑOL EN FORMAS DE TRATAMIENTO

*Məmmədova Rəhimə, ADU*

El idioma de una nación es, si así podemos decirlo, es el espejo donde más al vivo y con más fidelidad se reflejan su índole y tendencia, sus gustos y costumbres.

A pesar de ello, la definición sobre qué es una lengua se nos presenta variable en función del lingüista que analice su definición.

Según Saussure, una lengua es la modalidad lingüística utilizada por un colectivo social determinado, un grupo humano bien definido acorde a unas características comunes.

El presente artículo combina un análisis del uso de los pronombres de cortesía. Algunos autores los consideran conectores pragmáticos que pueden medir, de forma significativa, las relaciones entre los interlocutores, en función de la mentalidad de una época. (1.)

El tema de las formas de tratamiento tanto gramaticalizadas, es decir, las verbales y pronominales, como las formas de tratamiento es uno de los más estudiados en español. Las formas de tratamiento están sometidas a cambios porque en ellas inciden factores geográficos, sociolingüísticos, gramaticales, pragmáticos y socio-históricos.

Las formas pronominales que vamos a estudiar son las usadas entre criados, simples , las usadas entre éstos con sus amos, las usadas entre los amos con sus criados y las usadas entre los cónyuges y amantes y etc.

Las varias clases de pronombres (personales, posesivos, demostrativos, relativos, interrogativos e indefinidos) del latín estándar son continuadas por las lenguas románicas, pero con notables modificaciones en cada lengua, tanto en su sustancia fónica como en la estructuración de los paradigmas.

La expresión de la cortesía a través de los pronombres personales ha sido estudiada de forma parcial, bajo varios aspectos. Las investigaciones han tratado ciertos períodos históricos o cierto nivel sociocultural. La lengua española dispone actualmente de estudios sobre la expresión de la cortesía pronominal, pero, en general,

se han escrito pocos estudios que ofrezcan una síntesis desde una perspectiva histórica o comparativa. (4.)

En la lengua española han desarrollado pronombres especiales para el tratamiento cortés. En español además de la palabra *cortesía*, respectivamente *cortesia* se emplea la palabra *reverencia*, respectivamente *reverência* que viene del latín (*re-veri*) y significa manifestar respeto profundo, saludo respetuoso, cortesía, veneración, estima. (2.)

En el español actual peninsular el *usted* es forma reservada al tratamiento formal, respetuoso o distante. Usted/ustedes se usa más en algunas relaciones profesionales y, sobre todo, al dirigirse a personas desconocidas o mayores, con las que no se mantienen relaciones de confianza. También se usa *usted/ustedes* en relaciones jerarquizadas. Deriva etimológicamente del desgaste y abuso de la fórmula *vuestra merced*, provocado por factores sociales. Las causas sociales impulsaron el cambio de tratamiento de la oposición *tú/vos* a la de *tú/usted*, a lo largo de los siglos XV-XVII. Hoy en día son también las relaciones sociales las que mediatizan el uso del tú y del usted: familiaridad, edad, sexo, nivel cultural, costumbre y grado de amistad son las principales variables que condicionan el uso de los pronombres *tú* o *usted*. (5.)

Matte Bon, refiriéndose a *Usted/ustedes*, escribe: "igual que su equivalente en la mayoría de los idiomas, las formas **yo, tú, usted** y **ustedes** tienen una única forma para el masculino y para el femenino, debido a que remiten a personas que se definen exclusivamente por el papel que desempeñan dentro del circuito de la comunicación, y que son únicas: sólo hay un papel de hablante y un papel de oyente. El referente extralingüístico es, en cierto sentido irrelevante y puramente casual, ya que está estrechamente relacionado con cada momento o acto de enunciación." Al tratarse de formas que se refieren al destinatario del mensaje, al autor le "parece más correcto incluirlas entre las de segunda persona, aunque los manuales de gramática las incluyen entre las de tercera persona de singular y plural, debido a que requieren un verbo en tercera persona".

En español peninsular, pues, se usa *tú/vosotros* en las relaciones menos formales y *usted/ustedes* en las relaciones más formales. El tuteo es mucho más frecuente en el español peninsular. También es normal el tuteo en el trato profesor-alumno, y relativamente frecuente en las relaciones alumno-profesor, sobre todo en la enseñanza universitaria. Es, asimismo, bastante corriente el uso de tú en las relaciones con personas que trabajan en una serie de servicios públicos – en especial, si son jóvenes: dependientes de las tiendas, camareros de bares y restaurantes, chóferes de taxi, etc. (7.)

Investigando los estudios sobre este tema sacamos una conclusión que las explicaciones de Francisco M. B. un filólogo español nos están ofreciendo argumentos históricos, sociolingüísticos y estilísticos a la vez: "Solamente hay nuevos desarrollos fonéticos entre palabras distintas en casos especiales de desgaste, como el de los tratamientos. La puntillosidad de nuestros antepasados relegó el *tú* a la intimidad familiar o al trato con inferiores y desvalorizó tanto el *vos* que, de no haber gran

confianza, era descortés emplearlo con quien no fuese inferior. En otro caso, había que tratar de *vuestra merced* o *vuestra señoría*; la repetición originó el paso de *vuestra merced* a *vuesa merced, vuesarced, vuesançed,* etc., y finalmente a *voacé, vucé, vuced, vusted, usted;* en el siglo XVII estas últimas formas eran propias de criados y bravucones; sólo después hubo de generalizarse *usted.* De igual manera *usía* y *vuecencia* nacieron de *vuestra señoría, vuestra excelencia,* con formas intermedias como *vuecelencia, vusiría*; y *señor*, colocado como título delante de un nombre o adjetivo, degeneró en *seor, seó* y *so*.." (6.)

Esto es, el pronombre vos adquiere un valor familiar y amistoso, aunque no siempre fuera bien recibido, y usted y él tienen que convivir como marcadores de cortesía y de respeto.

El uso de formas de tratamiento es por supuesto es diferente, así que en España es el siguiente:

| | | |
|---|---|---|
| **Singular** | tú | usted |
| **Plural** | vosotros | ustedes |

Y en Hispanoamérica:

| | | |
|---|---|---|
| **Singular** | Tú/vos | usted |
| **Plural** | ustedes | |

Es decir ser cortés- desde el punto de vista pragmático, da una significación hacerle caso al otro, ser el responsable hacia el interlocutor durante la interacción verbal.

Según la investigación podemos notar que las funciones del tratamiento cortés no solamente desempeña gran papel en la lengua hablada, también en la escrita.

En la segunda parte del cuestionario, partimos de las formas de tratamiento y

preguntamos a quién se dirigirían los informantes con tú – usted – vos etc. En las tablas siguientes vemos las respuestas obtenidas, sin embargo no se incluyen las frecuencias (por ejemplo, "mamá" y "papá" se indicaron muy frecuentemente como personas a quien los sujetos se dirigen con cierta forma de tratamiento):

| **Forma** | **Forma Persona a quien se dirige con ella** |
|---|---|
| Tú | Mamá, papá, hermanos, novio, pareja, amigos |
| Usted | Personas mayores, desconocidos, amigos, compañeros, profesor, médico, doctor, cura |

| | |
|---|---|
| Señor, Señora | Personas mayores, papá, mamá, suegros, vecina, padres de amigos, desconocidos, vendedor, tendero, señores del bús |
| Don, Doña | Papá de un amigo, suegros, campesinos, desconocidos |
| Su Merced | Los reyes |
| Vos | Caleño, argentino |

Proponemos que tanto los estudiantes tutean sistemáticamente y sin vacilación a sus padres y hermanos y al esposo/a o novio/a. En todos los casos se trata de un Tú recíproco. Cuando los familiares son abuelos, tíos y suegros, el tuteo desciende ligeramente. Este descenso es casi imperceptible con los tíos; sin embargo. Alguna parte de los estudiantes se dirigen a sus abuelos con la forma Usted y en el resto de las situaciones no recuerdan si usan Tú o Usted.

En las relaciones familiares no se advierten diferencias notables entre los informantes de las dos poblaciones. En este ámbito, Tú es la forma dominante. El uso de Usted con los abuelos nos aventuramos a indicar a la pervivencia de un viejo sistema de valores de cortesía en el que se trataba de V a los padres. Este sistema se mantuvo en las zonas rurales hasta la generación de los abuelos de los actuales encuestados. Es probable que alguno de nuestros informantes todavía oiga a sus propios padres tratar de Usted a los abuelos en cuestión y, posiblemente, este tipo de conducta haga más lento el cambio a la forma Tú.

En el caso de los amigos, también el tuteo recíproco es la forma dominante, ya se trate de amigos actuales ya de amigos de la infancia. Su porcentaje de uso es prácticamente del 100%, sin que se observen diferencias entre los dos grupos de informantes. (3.)

En el análisis de la cortesía desde una perspectiva sociolingüística depende de algunas causas: naturaleza de los interlocutores, es decir, edad, sexo, jerarquía social y cultural, relación entre los interlocutores.

Teniendo en cuenta los estudios de algunos lingüistas podemos notar o dividir tres niveles de la cortesía que depende de la relevancia en la sociedad actual del factor clase: universal y propia de una civilización, cultural, es decir, característico de una cultura o personal de cada hablante.

Es posible sacar una conclusión que la lengua española prefiere la forma de tratamiento familiar. El *usted* actualmente tiene tres principales usos: el respetuoso y cortés, el distanciado que se encuentra en las relaciones profesionales.

A partir del análisis de una encuesta sociolingüística preliminar, encontramos diferencias significativas en el uso de las formas de tratamiento entre nuestros informantes de ambos sexos. Los varones manejan una escala que va del ustedeo de

distancia hasta el ustedeo de confianza pasando por la etapa intermedia del tuteo como lo indica Uber. El ustedeo de las mujeres se inserta generalmente bajo el ustedeo de distancia. Para ellas, el tuteo es el tratamiento de mayor confianza y solidaridad. Parte de los tratos no recíprocos, en sí bastante poco frecuentes, se explican por estos usos diferenciales por parte de los dos sexos.

## Bibliografía:


1. Alarcos Llorach, Emilio, Gramática de la lengua española, M., Espasa Calpe, 2002.
2. Alonso, Dámaso, "La muerte del usted", en *Del siglo de Oro a este siglo de siglas*, Madrid, Gredos, 1962, 264-267.
3. Artículo de Angela Bartens, Universidad de Helsinki, Notas sobre el uso de las formas de tratamiento en el español colombiano actual
4. Hernández Alonso, César, *Gramática funcional del español,* Madrid, Editorial Gredos, 1986.
5. Marín, Diego (1976): "El uso de tú y usted en el español actual", Hispania 55, 904-908.
6. Francisco M. B., *Gramática comunicativa del español,* M- 1993, p. 512.
7. Pla Cárceles, José (1923): "La evolución del tratamiento 'vuestra-merced'". In: Revista de Filología Española 10, 245-280.



## XÜLASƏ

**İspan müraciət formalarında Tú, Usted və Vos şəxs əvəzliklərinin bəzi üslubi-qrammatik xüsusiyyətləri**

İspan müraciət formalarında Tú, Usted və Vos şəxs əvəzliklərinin işlədilməsi etnik- milli-mədəni xüsusiyyətlərlə yanaşı, ölkə və ərazi baxımıindan da müxtəlifdir. Müraciət formalarının inkişafı və təkmilləşməsi ispan dilli xalqların ümumi mədəni yüksəlişində onun dilinin zənginləşməsi yolunda əsas rol oynayır.



## SUMMARU

**Some peculiarity of the use of the personal pronouns Tú, Usted vand Vos of the Spanish forms of appeals**

The use of the personal pronouns Tú, Usted vand Vos of the Spanish forms of appeals depends on the ethnic, cultural, national features of the Spanish language. The growth and the perfection of the forms of appeals play on important role in the general cultural progress of Spanish-speaking peoples.

